UOT 334.74

# KLASTERLƏR İNNOVASİYALI İQTİSADİYYATIN FORMALAŞMASI AMİLİ KİMİ

**R.V. QURBANOVA, S.R. SEYİDOVA**
**Sumqayıt Dövlət Universiteti**

*Məqalədə iqtisadiyyatın innovasiyalı inkişafınının zəruriliyi əsaslandırılmışdır. Klasterlər innovasiyalı iqtisadiyyatın infrastruktur elementi kimi nəzərdən keçirilmiş və onların formalaşması xüsusiyyətləri tədqiq edilmişdir. Həmçinin, klasterlərin innovasiya yönümlü iqtisadi inkişafda rolu qiymətləndirilmişdir.*

***Açar sözlər:*** *iqtisadiyyat, innovasiya, klaster, müəssisə, rəqabət, investisiya, istehsal, infrastruktur*

Sənaye müəssisələrinin yeni texnoloji qaydada rəqabət qabiliyyətliliyinin möhkəmləndirilməsi üçün innovativ inkişaf yoluna keçmək lazımdır. İnnovasiya yönümlü iqtisadi inkişaf növünə keçidi hökumətin bütün səviyyələrində bir sıra qanunvericilik aktlarının qəbul edilməsində görmək olar. İqtisadiyyatın innovativ inkişafı istehsal və texnoloji proseslərdə, eləcə də idarəetmə, təşkilat və təlimdə yeniliyin tətbiqini nəzərdə tutur. Azərbaycan üçün ən böyük problemlərdən biri istehsal və innovasiya fəaliyyəti sahəsində kiçik və orta sahibkarlığın inkişafıdır. Bu məqsədlə müasir texnologiyalara və avadanlıqlara malik lazımi infrastrukturu yaratmaq zəruridir. Elmi tədqiqatların və istehsalın inteqrasiyasını həyata keçirən innovasiya infrastrukturlarından biri klasterdir. Klasterləşmə qanuni cəhətdən əhəmiyyətli olan bir virtual konsepsiya deyil, iştirakçılarının ümumi maraqlarını ifadə edərək, onlara bütün faydaları gətirir. Dünya təcrübəsi göstərir ki, innovasiyalı iqtisadiyyatın inkişafında klasterlərin rolu regional və milli iqtisadiyyatların rəqabət qabiliyyətinin artırılmasında öz əksini tapır. Bu, elmi, təhsil və istehsal potensialını birləşdirməklə bu tip müəssisələrin rəqabət qabiliyyətinin artırılmasını təmin edir. İqtisadiyyatın inkişafına, investisiyaların cəlb edilməsinə və yeni iş yerlərinin yaradılmasına yardım edir. Bu baxımdan məqalənin mövzusunun nə qədər aktual bir problemə həsr olunduğunu görə bilərik.

**Klasterlərin formalaşması xüsusiyyətləri.** Klaster coğrafi cəhətdən zənginləşdirilmiş bir şəbəkədir. Klaster istehsal, emal və satışa yönəldilmiş qarşılıqlı tamamlayıcı bazar qurumlarını (fərdi yardımçı təsərrüfatlar, emal müəssisələri, tədqiqat institutları və təhsil müəssisələri, banklar, hakimiyyət orqanları və s.) birləşdirir. Bu tip infrastruktur bir qayda olaraq, müəssisələrin öz təşəbbüsləri ilə yaradılırlar. Klaster rəqabət üstünlüyünə, elmi nailiyyətlərə, innovativ texnologiyalara, nou-haulara, "unikal" strategiyaya malikdir. Əsas xüsusiyyətləri coğrafi uyğunluq, özünü təşkiletmə, sistemləşdirmə, böluşdürmə xarakteri, unikallıq, məlumat intensivliyi və yenilikçilikdir [3, s.14].

Elmi ədəbiyyatda klasterlərin sənaye və ərazi xüsusiyyətlərinə görə formalaşdığını müşahidə edirik. Amma, müasir şəraitdə klasterlərin belə təsnifatı səhvdir. Həqiqətən sənaye klasteri yalnız sənaye müəssisələrini deyil, innovasiya müəssisələrini, universitetləri, konsaltinq, marketinq və digər müəssisələri də özünə daxil edə bilər. Klasterlər, fəaliyyət sahələri üzrə sahibkarlıq kimi müəyyən edilməlidir. Məsələn, sənaye sektorunda sahibkarlıq qrupu və ya tikinti sektorunda sahibkarlıq qrupu və s.

Qeyd etmək lazımdır ki, bu günə qədər elmi ədəbiyyatlarda klasterin formalaşması üçün coğrafi yaxınlıq vurğulanmış olsa da, əsas stimullaşdırıcı amillərdən biri kimi göstərilmir. Amma, müasir şəraitdə klaster üzvlərinin vahid informasiya və kommunikasiya sahəsindəki fəaliyyətlərini həyata keçirmək çox vacibdir. Belə bir məkanı təmin etmək üçün ən müasir səviyyədə şəbəkə qarşılıqlı əlaqəni təmin edən informasiya və kommunikasiya sisteminə sahib olmaq lazımdır. Bundan əlavə, bu təsvir klaster daxilində fəaliyyətin innovasiya yönümlü olduğunu göstərir.

Klasterin formalaşmasının səciyyəvi xüsusiyyətləri aşağıdakılardan ibarət olmalıdır:

- bütövlükdə klasterin uzunmüddətli təsərrüfat, innovativ və digər strategiyasını müəyyən edən iri müəssisələrin mövcudluğu;
- əsas kütləvi müəssisələrin ərazi cəhətdən lokallaşdırılması;
- müəssisələr arasında təsərrüfat əlaqələrinin dayanıqlığı və dominant əhəmiyyəti;
- əsas idarəetmə, inkişaf proqramları, innovativ proseslər çərçivəsində klaster iştirakçılarının qarşılıqlı təsirinin uzunmüddətli əlaqələndirilməsi;
- yerinə yetirilən işlərin keyfiyyətinə nəzarət və s [4, s.21].

Bizim fikrimizcə klasterlərin ən fərqli xüsusiyyətlərindən biri öz-özünü təşkiletmədir. Dünya təcrübəsi göstərir ki, ən səmərəli klasterlər (məsələn, Silikon Vadisi və ABŞ-da Kaliforniya Şərab

klasteri) uzun müddət (10-40 il) özünü təşkiletmə əsasında fəaliyyət göstərmişdir. Burada kompyüterlərlə, onların komplektləşdiriciləri, proqram təminatları, rabitə, biotexnologiya və s. ilə məşğul olan minlərlə kompaniyalar (General Elektric, Eastman, Kodak, Shockley Transiston və s.) fəaliyyət göstərirlər. Bu klasterlərdə bir milyondan çox adam işləyir.

Ən məşhur Avropa klasteri Şərqi Fransada fəaliyyət göstərən Plastik vadisidir. Onun tərkibinə daxil olan müəssisələr polimerlərin hazır məhsula çevrilməsini, həmçinin məhsulların layihələndirilməsini, yeni formaların işlənməsini və s. həyata keçirirlər.

Hər iki klasterin texnoloji tərəqqinin qazanmaqlarının səbəbi bütün iştirakçıların ayrı-ayrılıqda deyil, bir şəbəkənin elementləri kimi fəaliyyət göstərmələrindədir [1, s.379].

Düşünürük ki, klasterlərin yaradılması sahəsində dünya ölkələrinin müsbət təcrübələrinin öyrənilməsi və bu təcrübənin ölkə xüsusiyyətlərini nəzərə almaqla tətbiqi Azərbaycan iqtisadiyyatının innovasiyalı inkişafına müsbət təsir edə bilər.

**Klasterlərin innovasiya yönümlü iqtisadi inkişafda rolunun qiymətləndirilməsi**

Səmərəli klasterlər həmişə unikal şəraitdə yaradılır və həmişə unikal rəqabət üstünlüyünə malikdirlər. Gələcək geoiqtisadi vəziyyət nəzərə alınmaqla, Azərbaycan qısa müddətdə səmərəli klasterlər yaratmalıdır ki, bu da unikal rəqabət üstünlüyünə malik ola bilsin. İkincisi, klasterlər öz ölkəsində və xarici bazarlarda öz brend nişanları ilə tanına bilsin. Odur ki, onların inkişafı üçün sinergetik yanaşmadan istifadə edilməsi lazımdır.

Klasterlərin inkişafı aşağıdakı əsas vəzifələri müəyyənləşdirməyə imkan verir:

- regional iqtisadiyyatın yeni rəqabət üstünlüklərinin formalaşması, qlobal rəqabət qabiliyyətinin təmin edilməsi;
- ərazinin investisiya cəlbediciliyinin artırılması, birbaşa və portfel investisiyalarını cəlb edilməsi;
- qlobal bazarlarda mövqelərinin möhkəmləndirilməsi və ixrac imkanlarının artırılması;
- kommunikasiya sisteminin inkişaf etdirilməsi;
- sinergetik təsirin baş verməsi əsasında ərazinin resurslarından istifadənin səmərəliliyinin artırılması;
- infrastrukturun inkişafı və regional sahibkarlıq mühitinin yaxşılaşdırılması;
- mezosəviyyədə sosial-iqtisadi şəraitin yaxşılaşdırılması və sahibkarlığın inkişafının yeni formalarının təşviqinin stimullaşdırılması [2, s.47].

Klasterlərin müsbət təsirinin əsas nəticələrinə daxildir:

- sənayenin daxili mühitində elm və təhsilin inkişafı nüvələrinin yaradılması;
- keyfiyyətcə yeni, intellektual olaraq formalaşma və sürətli inkişaf, dolğun reproduksiya prosesləri, regional iqtisadiyyatın innovasiya komponentinin artması;
- resursların intensiv istifadəsi.

Aktiv klasterləşmə siyasətinin həyata keçirilməsi klaster üzvlərinin bazar mövqelərinin möhkəmləndirilməsinə, regionların dinamik inkişafına, ixrac imkanlarının artırılmasına, müasir texnologiyalardan, idarəetmə metod və üsullarından istifadə olunmasına yönəldilməyə imkan yaradır.

Klasterlərin inkişafı vasitələrinin kompleksində infrastrukturların yaradılmasına da xüsusi yer ayrılmalıdır. Bu tip infrastrukturların yaradılması klasterləşmə sahəsində əməkdaşlığın inkişafına əlverişli şərait yaradar ki, nəticədə klasterləşmiş birliklər üçün tam hüquqlu bir baza yaranar, iqtisadiyyatda klasterli texnologiyaların istifadəsində təcrübə mübadiləsi genişlənər, ən yaxşı təcrübələr və məlumat mübadiləsi baş verər. Klasterləşmənin monitorinq sisteminin təşkili də mühüm əhəmiyyətə malikdir. Klasterlərə daxili olan infrastrukturların inkişafı baxımından nəzarət mexanizmini tətbiq etmək məsləhətdir. Klasterləşmə nəzarətinin əsasında onun inkişafının əsas hədəf göstəricilərinin və onların dəyərinin müəyyən edilməsi durur.

Mütəxəssislərin fikrincə, klaster müəssisələrinin üstünlüyü onun yüksək ixtisaslı mütəxəssisləri dəvət etmək və tərəf müqabilləri ilə bazar informasiyasının mübadiləsi imkanlarının olmasındadır. Klasterin tərkibində fəaliyyət göstərən müəssisələrə bu və ya digər layihələrin reallaşdırılması üçün əlaqələrin qurulması daha asan olur. Klaster müəssisələri yüksək innovasiyalılıqları ilə seçilirlər. Müəssisələri klasterləri yaratmağa sövq edən səbəblərə yüksək səmərəliliyi, yeni biliklərin alımasını, kooperasiyalaşmanı və s. aid etmək olar. Klaster əlaqələrinin qurulması bir çox innovasiya strategiyalarının yaradılması zamanı prioritet məqsəd kimi çıxış edirlər, bu səbədən dövlət orqanları klaster ideyalarının yayılması, layihələrin dəstəklənməsi, sənaye və elm sahələri arasında əməkdaşlıq əlaqələrinin yaradılması vasitəsilə işgüzar münasibətlərin qurulmasına maraq göstərirlər.

Bütün yuxarıda qeyd edilənlər klasterlərin inkişaf etdirilməsinin nə qədər mühüm olduğunu göstərir. Bu baxımdan onların təşkilinin stimullaşdırılması zərurəti meydana çıxır. Klasterlərin inkişafının stimullaşdırılmasının üç əsas səbəbini göstərmək olar:

- müəssisələr bir-birinə yaxın olduqda firmaların tədarükçülərə, ixtisaslı işçilərə, məlumatlara, xidmətlərə və təhsil mərkəzlərinə çıxış imkanları nəzərə alınmaqla məhsuldarlığını artırır;
- klasterləşmə innovasiyaların tətbiqini sürətləndirir;
- klaster informasiya və istehsalın kommersiyalaşdırılmasına kömək edir. Yeni firmaların yaradılması və yeni növ malların istehsalına başlamaq üçün əlverişli şərait yaradılır. Belə ki, klasterin formalaşdırılması üzrə şirkətlərin işçiləri arasında fikir mübadiləsi aparmaq, bilik və nou-hau haqqında məlumatlar verilir. Burada informasiya və kommunikasiya

texnologiyalarının fəal şəkildə istifadəsi mühüm rol oynayır.

**Nəticə**

Ümumiyyətlə, iqtisadi inkişafın müasir mərhələsində klasterli yanaşma əsasında sahibkarlığın inkişaf etdirilməsi və bu sektorun regionlar üzrə bölgüsündəki qeyri-bərabərliyini aradan qaldırılması məqsədilə fəal tənzimləmə və dövlət dəstəyi tədbirləri həyata keçirilməlidir.

İqtisadiyyatın innovasiya inkişafı şəraitində klasterlər regional istehsalın mövcud infrastrukturunu gücləndirmək üçün bir vasitə kimi deyil, yeni rəqabət üstünlüklərinin formalaşması kimi qiymətləndirilməlidir.

Ölkənin rəqabətqabiliyyətliliyinin artırılmasından klasterli inkişafın rolu çox böyükdür. Yerli şirkətlərin mobilləşdirilməsi və xarici investisiyaların ixtisaslaşmış regionlara birbaşa cəlbi sahibkarlığın inkişafını təmin etməklə yanaşı, sənayenin klasterli inkişaf strukturunu da formalaşdırmış olacaq.

Ölkəmizdə dövlət səviyyəsində olan son qərarlar göstərir ki, klaster siyasətinin həyata keçirilməsinə müəyyən bir yanaşma formalaşmağa başlamışdır. Amma klasterlərin inkişafının dövlət tənzimlənməsinə dair tənzimləyici çərçivənin təkmilləşdirilməsi və onların dövlət tərəfindən dəstəklənməsinin səmərəliliyini qiymətləndirmək üçün metodoloji bazasının daha da inkişaf etdirilməsində dövlətin rolu gücləndirilməlidir.

**ƏDƏBİYYAT**

1. Баранчев В . П .Управление инновациями . М .: Юрайт, 2012 .711 с. 2. Напольских Д.Л. Инновационный кластер как институт территориального развития. М.: Перо, 2013. 149 с. 3. Рекорд С.И. Развитие промышленно-инновационных кластеров в Европе: эволюция и современная дискуссия. СПб: СПбГУЭФ, 2010. 109 с. 4. Щепакин М.Б., Ю.В. Томилко Теоретико-методологические аспекты управления инновационным кластером. Краснодар: Юг, 2013. 147 с.

**Кластеры как формирования инновационной экономики**

**Р.В. Гурбанова, С.Р. Сеидова**

В статье обоснована необходимость развития инновационного экономики. Кластеры рассмотрены как элементы инфраструктуры инновационной экономик и исследованы особенности их формирования. Также, оценена роль кластеров в развитии инновационно нацеленной экономики.

***Ключевые слова:*** *экономика, инновации, кластер, предприятие, конкуренция, инвестиции, производство, инфраструктура*

**Clusters as a formation of innovative economy**

**R.V. Qurbanova, S.R. Seyidova**

The article substantiates the need for the development of an innovative economy. Clusters are considered as elements of the infrastructure of innovative economies and the features of their formation are investigated. Also, the role of clusters in the development of an innovatively targeted economy was evaluated.

***Key words:*** *economy, innovation, cluster, enterprise, competition, investment, production, infrastructure*